"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ



## BAKI YUNUS ƏMRƏ İNSTİTUTUNUN DİREKTORU ADPU-NUN QONAĞI OLUB

səh.2



## 20 YANVAR ŞƏHİDLƏRİ XALQIMIZIN MİLLİ İRADƏSİNİN SARSILMAZLIĞINI SÜBUT ETDİLƏR

səh.5




## ELMİ ŞURANIN İCLASI KEÇİRİLİB

səh.4



## QIŞ İMTAHAN SESSİYASI UĞURLA YEKUNLAŞIB

səh.7




## GƏNC ALİMLƏR VƏ TƏDQİQATÇILAR ŞURASININ YENİ İDARƏ HEYƏTİ SEÇİLİB

səh.6





## TƏLƏBƏ DÜNYASI

səh.7-8

*1921 -ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Yanvar, 2022 / № 08 (1111)

## UNİVERSİTETDƏ "NARKOMANLIĞA QARŞI MÜBARİZƏDƏ GƏNCLƏRİN ROLU" MÖVZUSUNDA GÖRÜŞ KEÇİRİLİB

2021-ci ilin dekabr ayının 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "Narkomanlığa qarşı mübarizədə gənclərin rolu" mövzusunda tələbələrlə görüş keçirilib.

ADPU və Səbail Rayon İcra Hakimiyyətinin (RİH) təşkilatçılığı ilə reallaşan tədbirdə universitetin 50-dək tələbəsi iştirak edib.

Görüşdə açılış nitqi ilə çıxış edən Səbail RİH başçısının müavini, Narkomanlığa və Narkotik Vasitələrin Qanunsuz Dövriyyəsinə Qarşı Mübarizə üzrə Səbail rayon komissiyasının sədri Eldar Ağayev bildirib ki, son dövrlərdə narkomanlığın gəncləşməsi ciddi narahatlıq doğurur və narkomanlığa qarşı mübarizədə gənclərimizin bu haqda dərin biliklərə malik olması, ayıq-sayıqlığı xüsusi rol oynayır.

Narkomanlığa və Narkotik VQDQ Mübarizə üzrə Dövlət Komissiyasının İşçi Qrupunun rəhbərinin müavini Tanrıverdi Aydınov dövlətin narkomanlığa qarşı mübarizə sahəsində gördüyü işlərdən, bu sahədə dövlət-vətəndaş birgə fəaliyyətinin vacibliyindən söz açaraq Dövlət Komissiyasının işi ilə bağlı vacib məqamları qeyd edib.

Azərbaycan Respublikasının Daxili İşlər Nazirliyi Baş Narkotiklərlə Mübarizə İdarəsinin əməkdaşı Seymur Quliyev narkomanlığın formaları, ona cəlbolunma üsulları, xüsusən son dövrlərdə sosial şəbəkələr vasitəsilə gənclərin aldadılaraq şirnikləşdirilib narkomanlığa cəlb edilməsi hallarının artmasını vurğulayıb. O, bildirib ki, bu birbaşa dövlətimizə və cəmiyyətimizə qarşı yönəlmiş qəsddir və bu bəladan qorunmaq üçün birgə fəaliyyət zəruridir. Xüsusən gənclər olduqca diqqətli olmalı, gələcəyimizi yetişdirəcək müəllimlərimiz övladlarımızın tərbiyəsində vətəndaş sayıqlığı nümayiş etdirməlidirlər. Bakı Narkoloji Mərkəzinin həkim-narkoloqu Təriqə Quliyeva narkomanlığın fəsadları haqqında geniş məlumat verərək narkomanlığa qarşı mübarizə sahəsində Bakı şəhəri ilə yanaşı Respublikanın əsas regional mərkəzlərində narkoloji dispanserlərin fəaliyyət göstərdiyini və bu mərkəzlərdə təkcə müalicə prosedurları deyil, eyni zamanda konsultasiya, maarifləndirmə, məsləhət xidmətlərinin göstərildiyini diqqətə çatdırıb.





Həkim-narkoloq bildirib ki, narkomanlığa qarşı vaxtında məlumatlandırmanın aparılması, onun fəsadlarının aradan qaldırılmasından qat-qat asandır.

Azərbaycan Milli QHT Forumunun prezidenti, Dövlət Komissiyasının üzvü Rauf Zeyni vətəndaş cəmiyyəti institutları adından tələbə-gənclərə səslənərək bildirib ki, daha firavan ölkə və cəmiyyət qurmaq yolunda bu mənfur düşmənə qarşı ümummili bir mübarizə aparmalıyıq. Bu gün adi vətəndaş, tələbə, gənc olmaq yetərsizdir, hazırlıqlı, bacarıqlı, məlumatlı gənclər ordusu olaraq səfərbər olmalıyıq.

ADPU-nun sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev faydalı görüşə görə natiqlərə təşəkkür edərək bu kimi vacib sosial tədbirlərin təşkili Pedaqoji Universitet olaraq daim diqqət mərkəzindədir. Görüş suallar ətrafında davam etdirilib.

## BAKI YUNUS ƏMRƏ İNSTİTUTUNUN DİREKTORU ADPU-NUN QONAĞI OLUB

2021-ci ilin dekabr ayının 20-də Bakı Yunus Əmrə İnstitutunun direktoru Səlcuq Qaraqılınc Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) qonağı olub. Görüşdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov və Beynəlxalq əlaqələr şöbəsinin müdiri Günay Məhərramova iştirak edib.

Görüş zamanı rektor prof. C.Cəfərov qonağa universitet haqqında ətraflı məlumat verərək həmçinin ötən həftə keçirilən universitetin 100 illik yubileyi barədə söz açıb.

Türkiyə universitetləri ilə əlaqələrin əhəmiyyəti, cari vəziyyəti və mümkün əməkdaşlıq imkanlarından danışılan görüşdə hər iki tərəfin maraqlı təklifləri və bir sıra layihələr müzakirə olunub.

S.Qaraqılınc ADPU-nun TÜRKSOY kafedrası və Türk araşdırmaları bölməsinin əməkdaşları ilə görüşərək bu strukturların geniş fəaliyyət istiqamətləri ilə tanış olub.





## MAGİSTRANTLAR HEYDƏR ƏLİYEV ADINA MÜASİR TƏHSİL KOMPLEKSİNDƏ

2021-ci ilin dekabr ayının 21-də universitetin SABAH Magistratura tələbələrinin "Öyrənmə və öyrətmə" dərsi çərçivəsində Heydər Əliyev adına Müasir Təhsil Kompleksinə təhsil səfəri təşkil edilib.

Ziyarətdə Reymond Finçin yeni tətbiq olunan proqramlar, o cümlədən Yale Emosional İntellekt Mərkəzində hazırlanmış Sosial və Emosional Öyrənmə (SEL) yanaşması (RULER) haqqında təqdimatı dinlənilmiş, müxtəlif təhsil proqramlarında tədris aparılan siniflərdə dərs müşahidələri aparılmış, sonda məktəb rəhbərliyi tərəfindən tələbələri maraqlandıran suallar cavablandırılmışdır.










## "BEYNƏLXALQ MƏKTƏBLƏRDƏ COĞRAFİYA TƏDRİSİ" MÖVZUSUNDA SEMİNAR KEÇİRİLİB





2021-ci ilin dekabr ayının 21-də universitetin Azərbaycan coğrafiyası və coğrafiyanın tədrisi texnologiyası kafedrası ilə Magistratura və doktorantura şöbəsinin birgə təşkilatçılığıyla coğrafiyanın tədrisi metodikası üzrə təhsil alan birinci və ikinci kurs magistrantları üçün "Beynəlxalq məktəblərdə coğrafiya tədrisi" mövzusunda seminar keçirilib. Seminarı açan kafedra müdiri dosent Oqtay Alxasov bildirib ki, gənc metodist tədqiqatçıların coğrafiya tədrisi sahəsində müxtəlif, eləcə də beynəlxalq təcrübəni öyrənmələri olduqca vacibdir. Bu istiqamətdə ardıcıl iş aparan Pedaqoji Universitet magistrantların sahənin tanınmış mütəxəssisləri ilə görüşlərinə xüsusi önəm verir.

Seminarda Mülki Aviasiya Agentliyinin əməkdaşı, beynəlxalq fənn olimpiadalarının keçirilməsi üzrə mütəxəssis və beynəlxalq təhsil eksperti, ADPU-nun coğrafiya müəllimliyi ixtisasının məzunu Elnur Osmanov magistrantlara beynəlxalq məktəblərdə coğrafiya fənninin tədrisi proqramları və sillabusları haqqında ətraflı məlumat verib. Bu sahədə dünyaca tanınan Kembric Universitetinin sillabusu və "İnternational Bachelor" (İB) proqramının strukturu barədə danışaraq bu proqramlar üzrə coğrafiya tədrisinin əsas üstünlüyünün dəqiq müəyyən olunmuş mərhələlər üzrə əsasən praktik və tədqiqatyönümlü aparıldığını bildirib.

Qeyd edək ki, bu proqramlar üzrə təhsil alan şagirdlər əldə etdikləri sertifikatlar əsasında dünyanın əksər ali təhsil müəssisələrinə birbaşa müraciət imkanı qazanırlar.

Seminar magistrantları maraqlandıran suallar ətrafında davam etdirilib.

## DOSENT YAQUT RZAYEVA İLƏ YOLASALMA MƏRASİMİ KEÇİRİLİB





2021-ci ilin dekabr ayının 21-də rektorluqda universitetin ibtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, pedaqogika üzrə fəlsəfə doktoru, dosent Yaqut Rzayeva ilə yolasalma mərasimi təşkil edilib.

Toplantıda rektor professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektor dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov, sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev, ümumi işlər üzrə prorektor Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, İbtidai təhsil fakültəsinin dekanı professor Fərrux Rüstəmov, universitet Həmkarlar İttifaqı Komitəsinin sədri dosent Vaqif Əliyev, rektorun köməkçisi Riyad Rüstəmli iştirak edib.

Rektor prof. C.Cəfərov bildirib ki, Yaqut Rzayeva 40 ildən artıq bir müddətdə ADPU-da zəngin və məhsuldar elmi-pedaqoji fəaliyyətlə məşğul olmuş, Rusiya-Azərbaycan elmi-pedaqoji əlaqələrinin inkişafında özünəməxsus rol oynamışdır. Ona gələcək həyat və fəaliyyətində yeni-yeni uğurlar arzulamışdır.

Qeyd edək ki, dos. Y.Rzayeva 1978-ci ildən ADPİ-dən məzun olduqdan sonra təyinatla institutda saxlanılmış və ötən 40 il ərzində bir çox vəzifələrdə çalışmışdır. Alim ADPU-da, əsasən, ibtidai siniflərdə təlim prosesinin təkmilləşdirilməsi sahəsində tədqiqatlar aparmış, uzun illər tədris prosesində iştirak etmişdir.

## ADPU-NUN BİR QRUP ƏMƏKDAŞI TƏLTİF EDİLİB

ADPU-nun 100 illiyi münasibətilə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsi (ATİAHİ RK) universitetin bir qrup həmkarlar təşkilatı fəallarına ATİAHİ-nin Fəxri Fərmanı və pul mükafatı təyin etmişdir.

Bu münasibətlə 2021-ci ilin dekabr ayının 22-də universitetin rektoru professor Cəfər Cəfərov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, Tədris departmentinin direktoru dosent Sənan Əliyev və ATİAHİ Respublika Komitəsinin sədr müavini Mirzə Cəfərzadənin iştirakı ilə yığıncaq keçirilib.

Yığıncaqda açılış nitqi ilə çıxış edən ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri dosent Vaqif Əliyev göstərilən diqqətə görə Respublika Komitəsinə təşəkkürünü bildirib və təltif olunan əməkdaşları təbrik edib.

ATİAHİ RK-nın sədr müavini M.Cəfərzadə ADPU-nun 100 illik yubileyi münasibəti ilə Həmkarlar İttifaqı Respublika Komitəsi adından universitetin rəhbərliyi və kollektivini təbrik edib.

Yığıncaqda universitetin fəallığı ilə fərqlənən 36 nəfər həmkarlar ittifaqı üzvünə Fəxri Fərman və pul mükafatı təqdim edilib.

Rektor prof. C.Cəfərov göstərilən diqqətə və təbrikə görə Həmkarlar İttifaqı Respublika Komitəsinə təşəkkürünü bildirib və təltif olunan əməkdaşları təbrik edərək işlərində yeni uğurlar arzulayıb.



## "XARİCDƏ TƏHSİL VƏ TƏQAÜD PROQRAMLARI" MÖVZUSUNDA İNFOSESSİYA KEÇİRİLİB



ADPU-nun Strateji İnkişaf Mərkəzi tərəfindən universitetin tələbə və müəllimləri üçün 2021-ci ilin dekabr ayının 29-da "Xaricdə təhsil və Təqaüd proqramları" haqqında infosessiya təşkil edilib. İnfosessiyada Erasmus+ magistr təqaüd proqramları, Global UGRAD mübadilə proqramı (ABŞ), İsveçin Visby+ və Visegrad təqaüd proqramları, habelə Yaponiya, Koreya, Böyük Britaniya və ABŞ-dakı təqaüd proqramları haqqında məlumat verilmişdir.

## "HƏYAT BİLGİSİ ÜZRƏ YENİ FƏNN KURİKULUMLARININ TƏTBİQİ" MÖVZUSUNDA TƏLİMLƏR UĞURLA BAŞA ÇATIB




2021-ci ilin 24-26 dekabr tarixlərində universitetdə təşkil olunan növbəti təlim uğurla başa çatıb. "Həyat bilgisi üzrə yeni fənn kurikulumlarının tətbiqi" mövzusunda təlim universitetin Magistratura və doktorantura şöbəsinin Davamlı təhsil və innovasiyalar bölməsi tərəfindən onlayn formada keçirilib.

Təlimin ilk günündə şöbə müdiri, s.e.ü.f.d. Rəşad Sadıqov giriş sözü ilə çıxış edərək universitet haqqında, rəhbərliyin xüsusi diqqəti və nəzarəti altında indiyə qədər təşkil edilən təlimlər barədə danışıb. Bildirilib ki, pandemiya dövrünün tələbləri və karantin qaydaları ilə əlaqədar olaraq, artıq ötən ilin yay aylarından etibarən ənənəvi təlimlər onlayn formada keçirilir. Bu isə öz növbəsində, təkcə Bakı şəhərində deyil, ölkənin müxtəlif regionlarından olan iştirakçıların iştirakına səbəb olur. Davamlı təhsil və innovasiyalar bölməsinin müdiri dos. Polad Mədədov çıxışında təlimin əhəmiyyəti, müdavimlər haqqında məlumat verib, iştirakçılara uğurlar arzulayıb. Sonra isə təlimçi, ADPU-nun Kimya və biologiya fakültəsinin baş müəllimi, dərslik müəllifi, ARTİ-nin dissertantı Rumiyyə Camalova sözügedən təlimin vacibliyi, onun məzmunu haqqında danışıb. Dünya ölkələrinin təhsil təcrübəsi göstərir ki, adi ünsiyyət yaratmaqdan tutmuş, kiçik iqtisadi layihələr qurub reallaşdırmağa qədər ən müxtəlif qabiliyyətləri özündə əks etdirən həyati bacarıqları şagirdi sinifdə subyekt kimi qəbul edən şagirdyönümlü təlim və inteqrativ fənlərin köməyi ilə yaratmaq mümkündür. Yerli və beynəlxalq təcrübələr nəzərə alınmaqla, "Azərbaycan Respublikasında ümumi təhsil pilləsinin dövlət standartları" sənədinə bu vəzifələrin yerinə yetirilməsində mühüm rol oynayan "Həyat bilgisi" fənni daxil edilmişdir. Bu fənn konkret bir elmin əsaslarını deyil, interqativ fənn olaraq ümumtəhsil məktəblərində tədris olunan təbiət və sosial fənn sahələrinə aid müəyyən elementləri özündə birləşdirir. "Həyat bilgisi" fənni şagirdin özünü bioloji, psixoloji, sosial və mənəvi tərəfləri ilə bütöv bir varlıq kimi dərk etməsi və reallaşdırması üçün lazım olan bilik, bacarıq və dəyərlər sistemi formalaşdırmağa və onu təkmilləşdirməyə kömək edən inteqrativ fənn olduğundan onun tədrisi də xüsusi bacarıq və ustalıq tələb edir.

Təlimdə respublikanın ümumtəhsil məktəblərindən ümumilikdə 26 nəfər, o cümlədən müəllimlər, tələbələr, məktəb rəhbərləri iştirak edib. Qeyd edək ki, təlimi müvəffəqiyyətlə başa vuran müdavimlərə müvafiq sertifikatlar təqdim ediləcək.

## ELMİ ŞURANIN İCLASI KEÇİRİLİB

Ötən ilin 30 dekabr tarixində Universitetin Elmi Şurasının iclası keçirilib. 2021/2022-ci tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlıq və qarşıda duran vəzifələrə həsr edilmiş iclasda universitetin rektoru professor Cəfər Cəfərov giriş sözü ilə çıxış edib.

Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov məruzə ilə çıxış edərək 100 illik yubiley çərçivəsində görülmüş işlər haqqında və 2021/2022-ci tədris ilinin payız semestrinin imtahan sessiyasına hazırlıq haqqında geniş məlumat verib.

Daha sonra cari məsələlər ətrafında müzakirələr aparılıb. İclasın yekununda universitetdə tədris prosesinin daha mütəşəkkil təşkil edilməsini təmin etmək məqsədilə ADPU-nun 100 illik yubileyi çərçivəsində görülmüş işlər və ADPU-nun 2021/2022-ci tədris ilinin payız sessiyasına hazırlığı barədə tədris işləri üzrə prorektor dosent Eldar Aslanovun məlumatı nəzərə alınaraq müvafiq struktur rəhbərlərinə lazımi təlimatlar verilib. O cümlədən filologiya üzrə elmlər doktoru, professor Hüseynova Mahirə Nağı qızının "Missiya" və "Ümumtürk dilləri dialekt və şivələrinin qarşılıqlı interasiyası" kitabları Dövlət Mükafatına təqdim edilməsi, ADPU-nun 2022-ci il üçün prioritet istiqamətlər üzrə fəaliyyət planının təsdiq edilməsi və digər cari məsələlərlə bağlı qərar qəbul olunub.

İclasın sonunda rektor prof. C.Cəfərov, universitet HİK sədri dos. V.Əliyev və THİK sədri dos. V.Məmmədova Azərbaycan Respublikası Həmkarlar İttifaqları Konfredrasiyasının "Xidmətlərə görə" medalı təqdim edilib.





## UNİVERSİTETƏ YENİ ELMİ KATİB TƏYİN EDİLİB



ADPU-nun rektoru professor Cəfər Cəfərovun yanvarın 5-də imzaladığı əmrlə Nərminə Abdulla qızı Abdullayeva Universitetin Elmi katibi təyin edilib.

Qeyd edək ki, N.Abdullayeva 1986-cı ildə Bakı şəhərində anadan olmuşdur. 2004-2008-ci illərdə Bakı Dövlət Universitetində (BDU) bakalavr, 2009-2011-ci illərdə magistr səviyyəsi üzrə təhsil almışdır. 2013-2016-cı illərdə isə BDU-da "Ehtimal nəzəriyyəsi" ixtisası üzrə dissertantlıq yolu ilə fəlsəfə doktoru proqramında təhsil almışdır.

2009-2018-ci illərdə Azərbaycan Turizm və Menecment Universitetində (ATMU) operator, Ümumi şöbənin müdiri, Tədris şöbəsinin müdiri, Keyfiyyət təminatı şöbəsinin müdiri vəzifələrində çalışmışdır. Eyni zamanda bu illər ərzində ali riyaziyyat, ehtimal nəzəriyyəsi və riyazi statistika fənləri üzrə tədris aparmışdır. 2018-ci ildən Pedaqoji Universitetin "Riyaziyyat və onun ibtidai kursunun tədrisi texnologiyası" və "Riyazi analiz" kafedralarında baş müəllim vəzifəsində çalışmışdır.

2011-2018-ci illərdə ATMU Həmkarlar İttifaqı Komitəsinin sədri, Mədəniyyət İşçiləri Həmkarlar İttifaqı Respublika Komitəsinin üzvü, "Gənclər komissiyası"nın üzvü olmuşdur.

İşlədiyi dövrdə Türkiyə, Şimali Kipr Türk Respublikası, Rusiya, İsveçrə, İspaniya, Portuqaliya, Bolqarıstan kimi ölkələrdə keçirilən müxtəlif konfrans və seminarlarda ezamiyyədə olmuşdur.

## AKKREDİTASİYA QAYDALARINA DAİR TƏLİM KEÇİRİLİB



Yanvarın 11-də ADPU-nun Keyfiyyətin təminatı şöbəsi və Təhsildə Keyfiyyət Təminatı Agentliyinin təşkilatçılığı ilə Universitetin struktur rəhbərləri üçün akkreditasiya qaydalarına dair təlim keçirilib.

Təlimdə giriş sözü ilə çıxış edən ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov bildirib ki, universitet 2019-cu ildən etibarən akkreditasiya prosesinə başlayıb. Daha sonra pandemiya səbəbindən proses ləngidiyindən və ali təhsil müəssisəsinin akkreditasiya qaydalarında dəyişikliklər olduğundan Agentliklə belə bir təlimin keçirilməsinə ehtiyac var. Pedaqoji Universitet 2022-ci il ərzində özünün institutional akkreditasiyasını həyata keçirməyi planlaşdırır. Akkreditasiyanın nəticələri Universitetin 2030-cu ilədək olan dövr üçün hazırlanacaq strateji planlaşdırması üçün əsas baza məlumatlarından biri rolunu oynayacaq.

Burada tələbələrin sosial həyatından beynəlxalq əlaqələrə qədər geniş spektrdə keyfiyyət parametrlərinin qiymətləndirilməsi aparılacaq. 2022-ci ildə ADPU-nun publik hüquqi şəxs və yenidən elmi-pedaqoji kadr hazırlığı mərkəzi statusu alması istiqamətində ciddi işlər görülür ki, akkreditasiya prosesinin nəticələri də buna təkan verəcək. Daha sonra Təhsildə Keyfiyyət Təminatı Agentliyinin Təlim və metodologiya şöbəsinin müdiri Asiman İlyasovun təqdimatında ali təhsil müəssisəsinin müvafiq struktur rəhbərləri üçün keyfiyyət təminatının müxtəlif parametrləri, universitetlərin akkreditasiyalarının aparılması üçün müvafiq qayda və dövlət tələbləri haqqında təlim keçirilib.

Qeyd edək ki, proses çərçivəsində Agentlik tərəfindən universitetdə daha bir neçə təlim də keçiriləcək.




# 20 YANVAR ŞƏHİDLƏRİ XALQIMIZIN MİLLİ İRADƏSİNİN SARSILMAZLIĞINI SÜBUT ETDİLƏR

## PEDAQOJİ UNİVERSİTETDƏ "20 YANVAR - QAN YADDAŞIMIZ" MÖVZUSUNDA TƏDBİR KEÇİRİLİB

Yanvarın 19-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Heydər Əliyev Mərkəzinin təşkilatçılığı ilə 20 Yanvar faciəsinin 32-ci ildönümünə həsr olunmuş tədbir keçirilib.

Tədbirdə universitet rəhbərliyi, fakültə dekanları, kafedra müdirləri, müvafiq strukturların rəhbərləri, müəllim və tələbələr iştirak ediblər.

Tədbir Vətən yolunda canlarını fəda etmiş şəhidlərimizin müqəddəs xatirələrinin yad edilməsi ilə başladı. Mərkəzin əməkdaşı Aytən Daşdəmirovanın giriş sözündən sonra rektor professor Cəfər Cəfərov geniş nitq söylədi. Natiq bildirib ki, 1990-cı ilin yanvar ayının 19-dan 20-ə keçən gecə keçmiş ittifaq qoşunları Bakı şəhərinə yeridilmiş, eləcə də təkcə Bakıda deyil, Azərbaycanın bölgələrində də xalqımıza qarşı böyük qırğınlar törədilərək mübarizə əzmimiz qırılmağa çalışılmışdır. Lakin informasiya blokadası şəraitində Azərbaycan xalqını ekstremist qüvvə adlandıran Qorbaçov rejiminə dünyanın tam dəstək verdiyi kritik bir vaxtda ümummilli lider Heydər Əliyev həyatını təhlükəyə ataraq Moskvadan bəyanatla çıxış elədi və 20 Yanvar hadisələrinə ilk dürüst siyasi qiymət verdi. Azərbaycan xalqı öz müstəqilliyini qazandı və müstəqilliyin qazanılması üçün şəhid olan övladlarının xatirəsini tarixə qızıl hərflərlə həkk etdi. H.Əliyevin rəhbərliyi ilə Azərbaycan Respublikası Milli Məclisi bu hadisələri hüquqi qiymət verdi, bu gün ümumxalq hüzn günü kimi qeyd olunmağa başlandı. Bu Azərbaycan güclü dövlətdir. Ulu öndərin layiqli davamçısı cənab Prezident İlham Əliyevin komandanlığı altında Azərbaycan öz torpaqlarını düşmən işğalından azad elədi.

Daha sonra baş müəllim Taleh Cəfərovun "20 Yanvar hadisələri – müstəqilliyə gedən yolda dönüş nöqtəsi kimi", professor Əyyub Kərimovun "20 Yanvar faciəsinə verilən hüquqi-siyasi qiymət" mövzularında məruzələri dinlənilib. Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov 20 Yanvar faciəsində şəhid olan alimlərlə bağlı xatirələrini bölüşüb.

Tədbirdə 20 Yanvar hadisələrinə aid videoçarx nümayiş olunub. Universitetin tələbə xorunun ifasında mərhum bəstəkarımız Nailə Mirməmmədlinin Baba Vəziroğlunun sözlərinə bəstələdiyi "Qələbə marşı" təqdim olunub, aktiv tələbələrdən Röya Qurbanova Bəxtiyar Vahabzadənin "Şəhidlər" poemasından bir parça səsləndirib.





## 20 YANVAR HADİSƏLƏRİNƏ ZAMANINDA VERİLƏN SİYASİ QİYMƏT



*Taleh Cəfərov*

*ADPU-nun Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru*

20 Yanvar Azərbaycanın istiqlal yolunun ilk zirvəsi, xalqımızın azadlıq istəyinin oyanış günüdür. Bu, uzun illər sovet imperiyasının əsarətində yaşayan xalqın azadlıq səsini ucaltdığı, öz suverenliyi uğrunda cəsarət nümayiş etdirdiyi şərəfli bir tarixdir.

1990-cı il yanvarın 19-dan 20-nə keçən gecə birbaşa Sovet İttifaqı Kommunist Partiyası Mərkəzi Komitəsinin baş katibi Mixail Qorbaçovun əmri ilə SSRİ Müdafiə Nazirliyi, Dövlət Təhlükəsizlik Komitəsi və Daxili İşlər Nazirliyinin qoşun hissələri Bakıya və Azərbaycanın bir neçə rayonuna yeridilib, dinc əhali ağır texnikadan və müxtəlif tipli silahlardan atəşə tutularaq kütləvi qətlə yetirilib. Tətbiq edilmiş fövqəladə vəziyyət haqqında əhali xəbərdar edilməmişdir. Fövqəladə vəziyyətin yanvarın 20-də saat 00-da tətbiq edilməsinə baxmayaraq, qoşun hissələri yanvarın 19-da saat 21-dən etibarən birinci olaraq Türkan-Qala tərəfdən şəhərə yeridildi. Fövqəladə vəziyyətin tətbiqi əhaliyə elan olunanadək hərbi qulluqçular 82 nəfəri amansızcasına qətlə yetirmiş, 20 nəfəri ölümcül yaralamışlar. Ümumilikdə Respublikada 147 nəfər öldürülmüş, 744 nəfər yaralanmış, 841 nəfər qanunsuz həbs olunmuş, 200 ev və mənzil, 80 avtomaşın, o cümlədən təcili yardım maşınları, dövlət əmlakı və şəxsi əmlak məhv edilmişdir.

20 Yanvar hadisələri nəticəsində Azərbaycanda sovet imperiyası özünün bütün mənəvi və sosial dayaqlarını itirdi. Baş vermiş hadisələr dünya azərbaycanlıların təşkilatlanmasına səbəb oldu. Dünya azərbaycanlıları ilk dəfə olaraq milli faciəmizin tanıdılması naminə yaşadıqları müxtəlif ölkələrdə təşkilatlanmağa başladılar. 20 Yanvar hadisələrindən sonra xalq daha bir gerçəkliyin şahidi oldu. Xalqın mübarizəsini, tökülən qanı siyasi niyyətləri üçün alətə çevirən Azərbaycan Xalq Cəbhəsinin başında duranların iç üzü açılmağa başlamışdı. Belə ki, 20 Yanvar hadisələrinə siyasi qiymət verilməsi tələbi ilə dəfələrlə çıxış edən Azərbaycan Xalq Cəbhəsi hakimiyyətə gəldikdən sonra bu mövzunu unutdu. 1993-cü ilə qədər Azərbaycana rəhbərlik edən şəxslərin heç biri bu faciə ilə bağlı əsl həqiqəti aşkar etməyə özündə cəsarət tapmadı. Xalq o günlərdə Ulu öndər Heydər Əliyevin yoxluğunu ən böyük həqiqət kimi dərk etdi. Ümummilli liderimiz hadisələrdən dərhal sonra, 1990-cı il yanvarın 21-də Azərbaycanın Moskvadakı Daimi Nümayəndəliyinə gəlib, təcavüzə kəskin etirazını bildirdi, faciəni törədənləri, şəxsən M.Qorbaçovu kəskin ittiham edərək sovet qoşunlarının Bakıdan çıxarılmasını tələb etdi. Xalqımızın ümummilli lideri Heydər Əliyevin 1990-cı il 21 yanvar tarixli Bəyanatı həm də faciəyə verilən ilk siyasi qiymət idi.

Ulu Öndərin təşəbbüsü ilə 1994-cü ilin mart ayının 29-da Milli Məclis "1990-cı il yanvarın 20-də Bakıda törədilmiş faciəli hadisələr haqqında" Qərar qəbul etdi. Ulu Öndər Heydər Əliyevin Fərmanı ilə 1998-ci ildə "20 Yanvar Şəhidi" fəxri adı təsis edildi.

Ulu Öndər Heydər Əliyevin yolunu uğurla davam etdirən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev də şəhidlərin xatirəsinin uca tutulmasına, şəhid ailələrinin sosial məsələlərinin həll olunmasına xüsusi diqqət ayırır. Dövlət Başçısının 19 yanvar 2006-cı il tarixli "20 Yanvar şəhidinin ailəsi üçün Azərbaycan Respublikası Prezidentinin təqaüdünün təsis edilməsi haqqında" Fərmanına əsasən, şəhid ailələrinə dövlət qayğısını artırmaq məqsədilə təqaüd verilir. Onların uyuduğu Şəhidlər Xiyabanında təmir və yenidənqurma işləri ilə yanaşı, Bakının Yasamal rayonundakı "20 Yanvar" dairəsində, Həsən bəy Zərdabi və Müzəffər Həsənov küçələrinin kəsişməsində Qanlı Yanvar şəhidlərinin xatirəsinə memorial abidə kompleksi ucaldılmışdır. Azərbaycan xalqı 1990-cı ilin yanvarında Azərbaycanın azadlığı uğrunda zirehli texnikanın qarşısına əliyalın çıxmış, Azərbaycanın müstəqilliyi uğrunda canlarından keçmiş oğul və qızlarını unutmur, bundan sonra da unutmayacaq.

## ADPU KOLLEKTİVİ 20 YANVAR ŞƏHİDLƏRİNİN XATİRƏSİNİ YAD EDİB

Yanvarın 20-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) rəhbərliyi və kollektivi – rektor və prorektorlar, fakültə dekanları, kafedra müdirləri, şöbə, bölmə və mərkəz müdirləri, professor-müəllim heyəti, tələbə təşkilatlarının nümayəndələri, aktiv tələbələr 20 Yanvar faciəsinin 32-ci ildönümü münasibətilə Şəhidlər Xiyabanını ziyarət edib, ölkəmizin azadlığı və müstəqilliyi uğrunda canlarından keçmiş şəhidlərin məzarları üzərinə tər çiçəklər düzülüb.

20 Yanvar şəhidləri öz canlarını qurban verərək Azərbaycanın yenidən müstəqilliyini qazanması yolunda xalqımızın milli iradəsinin sarsılmazlığını sübut elədilər. Bu gün müstəqil dövlətimizin hər bir vətəndaşı şəhidlərimizin xatirəsini əziz tutur.



## GƏNC ALİMLƏR VƏ TƏDQİQATÇILAR ŞURASININ YENİ İDARƏ HEYƏTİ SEÇİLİB

Yanvarın 12-də ADPU Gənc Alimlər və Tədqiqatçılar Şurasının üzvləri ilə görüş keçirilib. Görüşdə universitetin müvafiq struktur rəhbərləri, professor-müəllim heyəti və gənc tədqiqatçıları iştirak edib.

Açılış nitqi ilə çıxış edən ADPU-nun rektoru professor Cəfər Cəfərov bildirib ki, ali təhsil müəssisəsinin əməkdaşları arasında son illər gənc mütəxəssislərin sayı durmadan artır və universitetdə elmi kadr hazırlığı sahəsində xeyli uğur əldə edilib. Gənc alimlərin təşkilatlanması və fəaliyyətini koordinasiya etmələrində Şuranın önəmli rol oynayacağına inanırıq.

Universitetin elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov bildirib ki, ADPU-da gənclərin elmə təşviq edilməsi istiqamətində görülən tədbirlər çərçivəsində 2017-ci ildə Gənc Alimlər və Tədqiqatçılar Şurası təsis edilib. Şuranın ötən dövrdə formalaşması və fəaliyyətinə nəzər saldıqda qeyd edə bilərik ki, Şuranın üzvlərindən olan Nailə Hüseynova ölkəmizdə ilk dəfə korreksiyaedici təlim ixtisaslaşması üzrə elmlər doktoru dissertasiyasını bu yaxınlarda müdafiə edəcək, 12 nəfər fəlsəfə doktoru müdafiə ərəfəsindədir. Ümumilikdə ADPU-da hazırda 65 nəfər doktorant və dissertant tədqiqat işləri üzərində işləyirlər. Qeyd etmək yerinə düşər ki, son bir ay ərzində 4 nəfər fəlsəfə doktoru proqramı üzrə doktorluq dissertasiyasını müdafiə ediblər. Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev bildirib ki, elmi yaradıcılıq həm də tədris prosesində, tələbələrin hazırlanmasında önəmli halqadır. Tədqiqatçılığı olmayan müəllimin dərsləri quru və zəif olur. Çıxış edənlərdən professor Fərrux Rüstəmov, professor İbrahim Bayramov, kimya elmləri doktoru Əli Zalov da Şuranın fəaliyyətinə uğurlar arzulayaraq gələcək illərdə yüksəksəviyyəli sistemli tədqiqatların aparılması yolunda təşkilatın fəaliyyətinin faydalı olacağını vurğulayıblar. Daha sonra Gənc Alimlər və Tədqiqatçılar Şurasının İdarə Heyətinə üzvlər seçilib. Yeni heyətdə hazırda Universitetdə tədqiqatlar aparan və aktiv elmi-ictimai fəaliyyəti ilə fərqlənən gənclər təmsil olunur. İdarə Heyətinin üzvləri arasından gənc tədqiqatçı, filologiya üzrə fəlsəfə doktoru İlkin Əsgərov isə Şuranın İdarə Heyətinin sədri seçilib. İlkin Əsgərov Şura adından çıxış edərək ona göstərilən etimada görə təşəkkür edərək təşkilatın fəaliyyətində magistrant, doktorant və dissertantlar arasında əlaqələndirici, istiqamətverici və stimulverici rol oynamağı hədəflədiyini bildirib.






## YUBİLEY NƏŞRLƏRİ HAQQINDA VİKİPEDİYADA MƏQALƏLƏR YARADILIB




Tələbələrlə iş və ictimaiyyətlərlə əlaqələr şöbəsi tərəfindən ADPU-nun yubiley nəşrləri seriyasına daxil olan 8 kitab haqqında vikipediya virtual ensiklopediyasının Azərbaycan seqmentində məqalələr yaradılıb. Eyni zamanda vikipediyada məqalələrin sistematikliyini təmin etmək üçün məqalələr **"Azərbaycan Dövlət Pedaqoji Universitetinin yubiley nəşrləri"** adlı kateqoriyada birləşdirilib. Məqalələr şöbənin redaktoru Taleh Mirzəyev tərəfindən hazırlanıb.

***QR kodu skan edərək açılan vikikateqoriyadan məqalələrlə ətraflı tanış ola bilərsiniz.***



## ADPU-DA LAYİHƏLƏRİNİN İDARƏEDİLMƏSİ TƏLİMLƏRİ KEÇİRİLİR



Universitetdə Beynəlxalq əlaqələr üzrə prorektorluğun təşkilatçılığı ilə "Layihələrin idarəedilməsi" mövzusunda təlimlərə start verilib.

Təlimlər onlayn və əyani olmaqla hibrid formada təşkil edilir. Məqsəd ADPU sisteminə daxil olan strukturların əməkdaşlarından ibarət peşəkar layihə idarəetmə komandası formalaşdırmaqdır. Bu məqsədlə 9 alt modul üzrə təşkil edilən təlimlər mart ayınadək davam etdiriləcək. Təlimlər çərçivəsində yerli və beynəlxalq layihələrin planlaşdırılması, icrası, monitorinqi, büdcənin idarə olunması və s. kimi zəruri modulların mənimsənilməsindən sonra iştirakçılar tərəfindən təklif edilən praktik layihə təkliflərinin təqdimatı keçiriləcək.

Təlimin spikerləri ADPU-nun prorektoru, layihə idarəetməsi üzrə ekspert dosent Eldar Aslanov, ADPU-nun inzibati-iqtisadi məsələlər üzrə rektorun müşaviri Ümid Mehdiyev, Azərbaycan Gənc Müəllimlər Assosiasiyasının sədri Rüfət Əsədzadə, ekspertlər Aliyə Əhmədova, Parviz Bağırov, Eşqin Bayramov və Gülşən Bayramovadır. Təlimlərdə universitetin müsahibə əsasında seçilmiş 30-dək əməkdaşı iştirak edir.

## ADPU-NUN ALİMİNİN QARABAĞLA BAĞLI MƏQALƏSİ DƏRC EDİLİB

"Həyat elmləri və biotibb" jurnalının Qarabağa həsr edilmiş ikinci (2021) nömrəsində Universitetimizin əməkdaşı dosent Mətanət Əsgərovanın professor Əliəkbər Rəsuli və coğrafiya elmləri doktoru Səid Səfərovla birgə "Mapping of LC/LU changes inside the Aghdam district of the Karabakh economics region applying object-based satellite image " məqaləsi dərc olunmuşdur.

***QR kodu skan edərək məqalə ilə tanış ola bilərsiniz.***



## PAYIZ İMTAHAN SESSİYASI UĞURLA YEKUNLAŞIB



ADPU-da yanvarın 5-dən etibarən start götürən payız semestrinin imtahan sessiyası artıq uğurla yekulaşıb. Son üç semestr ərzində koranavirus pandemiyası onlayn formada təşkil olunduğu universitetdə cari semestrdən etibarən yenidən ənənəvi forma bərpa edilib. Bununla belə davam edən karantin rejiminin tələblərinə uyğun olaraq imtahan sessiyasında sanitar-gigiyenik tələblərə ciddi riayət olunub. Sıxlığın qarşısını almaq məqsədi ilə imtahanlar əvvəlki illərdən fərqli olaraq yalnız əsas tədris binasındakı imtahan zallarında deyil, ADPU-nun Bakı şəhərində yerləşən 4 tədris binasının hər birində paralel olaraq təşkil edilib. Eyni zamanda builki sessiyada ilk dəfə olaraq Filologiya fakültəsində eksperimental olaraq şifahi imtahan forması tətbiq edilib. Fakültədə indiyədək xarakterik fənlərdən şifahi imtahanlar təşkil edilsə də, ilk dəfə olaraq bütün ixtisas fənləri üzrə imtahanlar şifahi keçirilib. Təcrübələrin təhlili əsasında gələcəkdə universitetdə fənlərin xüsusiyyətlərinə uyğun olaraq müxtəlif imtahan modellərinin tətbiqi istiqamətində tədbirlərin görülməsi nəzərdə tutulur.

Sessiya boyu tələbələrə operativ xidmət göstərmək və virusa yoluxma riskini minimuma endirmək məqsədi ilə ənənəvi qayda ilə yanaşı onlayn apellyasiya müraciəti üçün imkan yaradılıb.

Yekun statistikaya görə Universitetin fakültələri, filialları və Pedaqoji Kollecdə ümumilikdə 3399 fənn üzrə 4169 qrupda 94 059 nəfər tələbə imtahanlarda iştirak edib. Onlardan 53 404 nəfəri Bakıdakı fakültələrin, 16 707 nəfəri bölgələrdəki beş filialın, 23 948 nəfəri isə Azərbaycan Dövlət Pedaqoji Kollecinin payına düşür. 313 fənn üzrə şifahi imtahan təşkil edilib. Ümumilikdə 2082 nəfər tələbə imtahana buraxılmayıb, 1097 nəfər tələbə isə bu və ya digər səbəblərdən imtahana gəlməyib. Qayda pozuntularına görə ümumilikdə 763 nəfər tələbə imtahandan xaric olunub. Qeyd edək ki, imtahan zallarında Covid-19 infeksiyasına yoluxmuş, səhhətində ciddi problem olan tələbələr olmayıb. Bir neçə belə halda əvvəlcədən xəbər verilməklə həmin tələbələr üçün imtahan tarixi dəyişdirilib, yaxud onlayn imtahan təşkil edilib.

# TƏLƏBƏ DÜNYASI

## ADPU TGT "THE REAL COMMANDER" ADLI DƏYİRMİ MASA KEÇİRİB

2021-ci ilin dekabrın 24-də ADPU-nun Heydər Əliyev Məktəbinin lektoriyasında ADPU Tələbə Gənclər Təşkilatının (ADPU TGT) Xarici dillər klubu və Tarix və coğrafiya fakültəsinin TGT-nin birgə təşkilatçılığı ilə "The real Commander" adlı dəyirmi masa təşkil olunub. Tədbiri giriş nitqi ilə açan ATGTİ-nin sədr müavini, ADPU TGT-nin sədri İsmayıl Nəsirov 2020-ci ildə "Dəmir Yumruq" əks həmlə əməliyyatının memarı olan Prezident İlham Əliyevin çoxşaxəli fəaliyyətindən söz açmış və onun ulu öndər Heydər Əliyevin əsasını qoyduğu dövlət gənclər siyasətini uğurla davam etdirdiyini vurğulamışdır. Daha sonra çıxış edən universitetin Azərbaycan tarixi kafedrasının müdiri dosent Naibə Əhmədova və kafedranın müəllimi dosent Zakir Kərimov Heydər Əliyevin Azərbaycançılıq məfkurəsinin, uzaqgörən siyasətinin ardıcılı İlham Əliyevin respublikaya rəhbərlik etdiyi illər ərzində ölkəmizin beynəlxalq arenada nüfuzunun kifayət qədər artdığını və 44 günlük Vətən müharibəsi zamanı qazanılan qələbədə cənab Prezidentin siyasi savadının, diplomatik bacarığının, natiqlik qabiliyyətinin müstəsna rolu olduğunu qeyd etmiş, ümumilikdə mövzu ilə əlaqədar geniş kontekstdə çıxış etmişlər.

Görüş tələbələr və müəllimlər arasında diskussiya ilə davam etmişdir.

Tədbir əsnasında Müzəffər Ali Baş Komandana həsr olunmuş videoçarx nümayiş olunub.





## YENİ İLƏ UŞAQLAR BİRGƏ

ADPU Könüllüləri Tələbə Birliyi (AKT) üzvləri Yeni ili "Ümid yeri" uşaq evində valideyn himayəsindən məhrum olunmuş uşaqlarla birgə qeyd ediblər.

Yanvarın 1-də AKT-nin Tarix və coğrafiya fakültəsindən olan üzvləri Yeni il münasibətilə "Ümid yeri" uşaq evini ziyarət ediblər. Ziyarətdə uşaqlara yeni il hədiyyələri və oyuncaqlar təqdim edilib, tort kəsilib, maraqlı oyunlar keçirilib.



## 100 İLLİYİN KÖNÜLLÜLƏRİ









Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 2021-ci ilin dekabrın 17-də keçirilən təntənəli 100 illik yubiley mərasiminin təşkilində universitetin tələbələrinin böyük rolu olub. Belə ki, mərasimə hazırlıq və yubileyin keçirilməsində ADPU-nun 50 nəfərdən çox ictimai fəal, təşkilatçı tələbələri iştirak edib. Könüllülər universitetin Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin idarəçiliyində möhtəşəm komanda işi sərgiləyərək tədbirin yüksək səviyyədə təşkilində əvəzsiz xidmətlər göstərmişlər. Dekabrın 25-də universitetdə könüllülərlə görüş keçirilib. Görüşdə ADPU-nun prorektoru professor Fikrət Rzayev, Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli və mətbuat katibi Cavid Hüseynov iştirak edib.

Könüllü tələbələr önündə çıxış edən sosial və humanitar məsələlər üzrə prorektor prof. F.Rzayev bildirib ki, tələbələrimizin bu cür peşəkar tədbirlərdə qazandıqları təcrübələr bizləri sevindirir və bu onların gələcək fəaliyyətlərində böyük stimul yaradacaq. Bu gün Pedaqoji Universitetin tələbə-gənclərinin ictimai həyatda iştirakçılığı yüksələn xətt üzrə müsbət yöndə inkişaf edir. Universitetin 100 illik yubiley tədbiri də buna ən yaxşı misallardandır.

Daha sonra könüllülərə universitet rəhbərliyi adından fəxri fərmanlar, simvolik yubiley hədiyyələri və nəşrləri təqdim edilib.

Dekabrın 28-də isə 100 illik yubiley mərasimində aktiv iştirak edən "MEH" ədəbi dərnəyinin üzvləri təltif olunublar. Təltifetmə mərasimində sosial və humanitar məsələlər üzrə prorektor prof. F.Rzayev və beynəlxalq əlaqələr üzrə prorektor, "MEH" ədəbi dərnəyinin yaradıcısı professor Mahirə Hüseynova iştirak edib. Tələbələrə universitet rəhbərliyi adından fəxri fərmanlar və simvolik yubiley hədiyyələri və nəşrləri təqdim edilib. Prorektorlar tələbələri təbrik edərək onların universitet və bütövlükdə təhsil ictimaiyyəti üçün mühüm tarixi hadisədə iştirakını yüksək qiymətləndiriblər.

Qeyd edək ki, 2019-cu ildən ADPU-da fəaliyyət göstərən dərnəyin üzvləri ADPU-nun 100 illik yubiley mərasiminin bədii hissəsində hazırladıqları kompozisiya ilə çıxış ediblər.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## ADPU TƏLƏBƏ GƏNCLƏR TƏŞKİLATI "AZADLIĞA GEDƏN YOL" ADLI TƏDBİR KEÇİRİB

Yanvarın 19-da Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının (ATGTİ) ofisində Azərbaycan Dövlət Pedaqoji Universiteti Tələbə Gənclər Təşkilatının (ADPU TGT) təşkilatçılığı ilə "Azadlığa gedən yol" adlı tədbir keçirilib.




Tədbirdə 1990-cı ilin 20 Yanvar hadisələrinin şahidi Mənsur Qocayev və ADPU-nun Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının müəllimi Laçın Mustafayev iştirak etmişlər. Qanlı Yanvar hadisələrini özündə əks etdirən videoçarxın nümayiş olunmasından sonra M.Qocayev və L.Mustafayev 32 il əvvələ qayıdaraq baş verənlərin Azərbaycan xalqının müstəqilliyə gedən şərəfli yolda mübarizə ruhunu daha da artırdığını vurğulamışlar.

1990-cı ilin yanvar ayının 21-də Moskvada çıxış edən Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin baş verən qanlı terrora lazımi siyasi qiymət verilməsinin labüdlüyünü bütün dünyaya çatdırmasının həmin dönəm çox böyük tarixi bir məqam olduğu qeyd olunmuşdur.

Tədbirdə ADPU TGT-nin 30-a yaxın üzvü iştirak etmişdir.

## VOLEYBOL ÜZRƏ OĞLANLARARASI UNİVERSİTET ÇEMPIONATININ QALİBLƏRİ BƏLLİ OLDU

2021-ci ilin dekabr ayının 29-da Universitet Tələbə Həmkarlar İttifaqı Komitəsinin (ADPU THİK) təşkilatçılığı ilə keçirilən oğlanlararası voleybol yarışı üzrə universitet çempionatının final mərhələsi baş tutub. Final qarşılaşmasında Tarix və coğrafiya fakültəsinin komandası Riyaziyyat fakültəsinin komandası ilə üz-üzə gəlib. Gərgin mübarizənin sonunda Tarix və coğrafiya fakültəsinin TC-1 komandası rəqibini üstələyərək çempionatın qalibi olub. Riyaziyyat fakültəsi II, Kimya və biologiya fakültəsi isə III yeri tutublar. Qalib komandalar kubok və diplomlarla mükafatlandırılıb.





## ADPU-NUN 4 TƏLƏBƏSİ TƏHSİLLƏRİNİ DANİMARKADA DAVAM ETDİRƏCƏKLƏR



2021/2022-ci tədris ilinin yaz semestrində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) bir neçə nəfər tələbəsi ali təhsil müəssisəsinin qoşulduğu mübadilə proqramı çərçivəsində dünyanın müxtəlif universitetlərində bir semestr müddətində təhsil almaq imkanı qazanırlar.

"Erasmus+KA1" mübadilə proqramı çərçivəsində universitetin dörd nəfər tələbəsi, Tarix və coğrafiya fakültəsinin tələbəsi Abbasov Elmir, İbtidai təhsil fakültəsinin təbəsi Tağıyeva Səbinə, Məktəbəqədər təhsil fakültəsinin tələbələri Əliyeva Yəmən və Hamed Noroozi Danimarkanın Kopenhagen Universitet Kollecində bir semestr müddətində təhsillərini davam etdirəcəklər.

Qeyd edək ki, ADPU "Erasmus+KA1" proqramıyla 2016-cı ildən bəri Danimarkanın Kopenhagen Universitet Kolleci ilə tələbə-müəllim mübadiləsi həyata keçirir.

## BAŞSAĞLIĞI

Təəssüf hissi ilə bildiririk ki, Ümumi pedaqogika kafedrasının dosenti, müəllimlərin, tələbələrin, universitet əməkdaşlarının xatirəsində əvəzolunmaz şəxs kimi qalan Miri Həsənov və Riyaziyyat və onun tədrisi texnologiyası kafedrasının müdiri, müəllimlərin, tələbələrin və universitet əməkdaşlarının sevimlisi, pedaqoji elmlər doktoru, professor Azadxan Adıgözəlov dünyasını dəyişmişdir.

ADPU rəhbərliyi, elmi-pedaqoji və tələbə heyəti adından mərhum pedaqoqlarımızın ailələrinə və yaxınlarına dərin hüznlə baş sağlığı verir, səbr diləyirik.

Allah Rəhmət Eləsin!





Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 389

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.